QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Mart 2017
№ 1 (1080)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Novruz bayramı münasibətilə Azərbaycan xalqına təbrik

***Əziz həmvətənlər!***

Sizi Novruz bayramı münasibətilə səmimi qəlbdən təbrik edir, hər birinizə cansağlığı və xoş əhval-ruhiyyə arzulayıram.

Novruz bayramı ulu babalarımızın zəngin mənəvi aləmini dolğun təcəssüm etdirir. Ən qədim təsəvvürləri qoruyub saxlamış bu bayram təbiətlə insanın sarsılmaz vəhdətinə dərin ehtiramın ifadəsidir. Odlar diyarına onun hər gəlişi min illərin ənənəsinə uyğun, rəngarəng mərasimlər və el şənlikləri ilə müşayiət olunmuşdur. Milli özünüdərkin təşəkkülündə müstəsna mövqeyə malik Novruz ənənələri çoxəsrlik tarixi keçmişinə daim ehtiramla yanaşan xalqımızın dünya mədəniyyətinə misilsiz töhfələrindəndir. Həmin ənənələrin müqəddəs ərməğan kimi həmişə uca tutulması və layiqincə yaşadılaraq gələcək nəsillərə çatdırılması hər bir azərbaycanlının vətəndaşlıq borcudur.

Bahar bayramı dövlət müstəqilliyimizin nailiyyəti olaraq rəsmi statuslu əsl ümumxalq bayramı səviyyəsində ölkəmizin bütün guşələrində qeyd edilir. Qloballaşma dalğasının geniş vüsət aldığı və dünyanı sürətli dəyişikliklərə məruz qoyduğu bir vaxtda o, tükənməz mənəvi gücü sayəsində dini-mənəvi dəyərlərimizə, tarixi-mədəni irsimizə bağlılığımızın təntənəsinə çevrilmişdir. Yaz bayramı yeniləşdirici ruhu və ılıq nəfəsiylə insanlar arasında səmimi münasibətlərə yol açır, dostluq, mərhəmət və bərabərlik duyğularını gücləndirir, cəmiyyətin inkişafının ahəngdarlığını təmin edir. Onda gələcəyə inam aşılamaq və könüllərdə ülvi duyğular oyandırıb xeyirxahlığa sövq etmək qüdrəti vardır. Ən yüksək dəyərləri özündə topladığı üçün də belə bir mənəviyyat xəzinəsi bəşəriyyətin mədəni irs nümunələri siyahısında yer almışdır.

Mən torpaqlarımızın müdafiəsində mətinliklə dayanan Azərbaycan əsgərinə bayram təbriklərimi yetirirəm. Vətənimizin ərazi bütövlüyünün qorunması uğrunda şəhid olmuş qəhrəman övladların unudulmaz xatirəsini bir daha ehtiramla yad edərək onlara Allahdan rəhmət, yaxınlarına səbir diləyirəm.

Dünya azərbaycanlılarının həmrəyliyinin rəmzi Novruz bayramını xaricdə yaşayan soydaşlarımızın milli məfkurə işığında bizimlə birgə qeyd etmələri onlarda yurdumuza bağlılıq hisslərini gücləndirir.

Arzu edirəm ki, öz gəlişiylə bu gözəl bayram hər evə, hər ocağa bol ruzi-bərəkət gətirsin və hamınıza yeni sevinclər bəxş eləsin.

***Xalqımızın əziz Novruz bayramı mübarək olsun!***

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 17 mart 2017-ci il.*

## Elmi Şuranın iclası

Martın 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının Heydər Əliyev məktəbinin lektoriyasında iclası keçirilib. Elmi Şuranın iclasında ADPU-da fəaliyyət göstərən İctimai Şuranın üzvləri: "Azərbaycan müəllimi" qəzetinin baş redaktoru Bayram Hüseynzadə, təhsil eksperti, Korrupsiyaya Qarşı Mübarizə Fondunun icraçı direktoru Vasif Mövsümov, "Cəmiyyət və Vətəndaş Münasibətləri" İctimai Birliyinin sədri Əhməd Abbasbəyli, Şəmsi Əsədullayev Xeyriyyə İctimai Birliyinin icraçı direktoru Cəsarət Hüseynzadə və kütləvi informasiya vasitələrinin nümayəndələri iştirak ediblər. Qeyd edək ki, ölkəmizdə həyata keçirilən təhsil islahatlarının əsas istiqamətlərindən biri olan və bütövlükdə tədrisin keyfiyyətinin yüksəldilməsinə xidmət edən ictimai iştirakçılığın miqyasının genişləndirilməsinə ADPU-da hazırda xüsusi diqqət yetirilir.

Elmi Şuranının iclasını giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, iclasın gündəliyinə ADPU-da payız semestrinin imtahan sessiyasının yekunları barədə, ADPU-nun nəzdində Dissertasiya Şurasının fəaliyyəti haqqında (2014-2016-cı illər), ADPU-nun Kitabxana-informasiya mərkəzinin fəaliyyəti barədə və cari məsələlər daxildir. Rektor universitetdə həyata keçirilən islahatlardan danışaraq qeyd edib ki, bütün bu islahatlar təhsilin inkişafına yönəlib. Universitetdə şəffaf mühitin yaradılması tələbələrin təhsilə marağını daha da artırmağa imkan verir. ADPU-nun kollektivi bu vacib istiqamətdə birgə fəaliyyət göstərməlidir. Universitetdə kompleks tədbirlər həyata keçirilməli, o cümlədən imtahanların keçirilməsinə diqqət artırılmalıdır. Biz yaz semestrinin imtahan sessiyasına daha məsuliyyətlə hazırlaşmalıyıq.

ADPU-da payız semestrinin imtahan sessiyasının yekunları barədə Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev məlumat verib. Dosent S.Əliyev bildirib ki, 2016-2017-ci tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlıq, imtahan sessiyasının təşkili və keçirilməsi, o cümlədən fakültə dekanlarının, kafedra müdirlərinin və digər aidiyyəti qurumların həyata keçirəcəkləri vəzifələri müəyyən edən ADPU rektorunun 07.12.2016-cı il tarixli 3/405 nömrəli xüsusi əmr verilmişdir. Universiteti üzrə müvafiq olaraq səkkiz fakültə üzrə payız imtahan sessiyasının mütəşəkkilliyinin təmin edilməsi məqsədilə Apelyasiya Komissiyası yaradılmış, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığı və obyektivliyi təmin etmək və yarana biləcək neqativ halları aradan qaldırmaq məqsədilə bir sıra müvafiq tədbirlər görülmüşdür. Rektorun müvafiq əmri ilə İmtahan Qərargahı yaradılmış və imtahan sessiyasının mütəşəkkilliyinin təmin edilməsi məqsədilə qərargah üçün hər cür şərait təmin edilmişdir. Tədris ilinin birinci yarımilində universitetdə struktur və kadr islahatları ilə paralel payız imtahan sessiyasının yüksək səviyyədə təşkili əsas vəzifəmiz olmuşdur. Tədris prosesinin tərkib hissəsi kimi payız semestrinin imtahan sessiyasını normal mənəvi-psixoloji şəraitdə, obyektiv, heç bir neqativ hala yol vermədən keçirmək üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılmışdır. İmtahanların aparılması üçün lazımi sənədlər, imtahan vərəqləri tələblərə müvafiq hazırlanmışdır.

Payız semestrində universitet üzrə ali təhsilin bakalavriat səviyyəsində əyani şöbədə 9063 nəfər tələbə təhsilə cəlb edilmişdir. Onlardan 8879 nəfəri imtahanlarda iştirak etmişdir. 6709 nəfər tələbə imtahanları müvəffəqiyyətlə vermişdir. Onlardan 41 nəfər "əla", 505 nəfər "əla", "çox yaxşı" və "yaxşı", 6163 nəfər qarışıq qiymətlər almışdır. 2170 nəfər imtahanlardan qeyri-müvəffəq qiymət almışdır. Universitet üzrə müvəffəqiyyət 76%, keyfiyyət 6% olmuşdur. Ötən ilin müvafiq dövründə müvəffəqiyyət 84%, keyfiyyət 3% olmuşdur. Bakalavriat səviyyəsində qiyabi şöbədə 680 nəfər tələbə təhsilə cəlb edilmişdir və onlardan 601 nəfər imtahanlarda iştirak etmişdir. Qiyabi şöbədə təhsil alan tələbələrdən 462 nəfəri müvəffəq qiymət almışdır. 1 nəfər imtahanları "Əla" qiymətlərlə vermiş, 461 nəfər isə qarışıq qiymətlər almışdır. 139 nəfər imtahanlardan qeyri-müvəffəq qiymət almışdır. Qiyabi şöbə üzrə müvəffəqiyyət 77%, keyfiyyət faizi olmamışdır. Keçən ilin müvafiq dövründə müvəffəqiyyət 83%, keyfiyyət 1% olmuşdur. Magistratura səviyyəsində əyani şöbədə 807 tələbə təhsilə cəlb edilmişdir. Bunlardan 789 nəfər imtahan vermiş, 687 nəfər imtahanlarda müvəffəq qiymətlər almışdır. Magistratura səviyyəsi üzrə müvəffəqiyyət 87%, keyfiyyət 41% olmuşdur. Magistratura səviyyəsində qiyabi şöbədə 3 nəfər təhsil almışdır. 2 nəfər imtahan vermiş və 1 nəfər bütün imtahanları müvəffəqiyyətlə vermişdir. Magistraturanın qiyabi şöbəsi üzrə müvəffəqiyyət 50%, keyfiyyət faizi isə olmamışdır.



Payız semestrinin imtahan sessiyası dövründə Apelyasiya Komissiyasına yazılı imtahanlarla bağlı 1480, test imtahanları ilə bağlı 140, ümumilikdə 1620 ərizə daxil olmuşdur. Onlardan qiymətləndirmə düzgün olmadığı üçün yazılı keçirilən 416, testlə keçirilən imtahanlardan isə 14 tələbənin müraciəti müsbət həll edilmişdir.

Payız semestrinin imtahan sessiyasında İmtahan Qərargahına ümumilikdə 372 nəfər müraciət etmişdir. Onlardan 24 nəfəri imtahan zamanı əvvəlcədən xəbərdarlıq edilməsinə baxmayaraq, imtahan zamanı bir-birləri ilə danışdığına və bir-birindən sualların cavablarını soruşmağına görə, 58 nəfəri imtahan başlandıqdan sonra mobil telefondan istifadəyə görə, 18 nəfəri qulaqcıqdan və digər texniki vasitələrdən istifadəyə görə, 38 nəfəri isə köçürmək, köçürmyə şərait yaratmaq, köməkçi vasitələrdən istifadə etdiklərinə görə, imtahan qaydalarını pozduğu üçün nəzarətçilər tərəfindən imtahan otağından çıxarılaraq, protokol tərtib edildiyi, imtahan işləri ləğv olunduğu üçün şikayətlə müraciət etmişlər. Bundan əlavə, şikayətçilərin 91 nəfəri VTS-TEST sistemi ilə imtahan verərkən müxtəlif səbəblər nəticəsində "qara siyahıya" düşdüklərinə görə, 15 nəfəri imtahan zallarında olan nəzarətçilərdən, 8 nəfəri imtahan verilən fənni tədris edən müəllimlərdən, 19 nəfəri isə Münaqişə Komissiyasından şikayət etmişlər. 96 nəfər isə zamanında gəlməyərək imtahana geckmələri səbəbi ilə müraciət etmişdir. Sessiya müddətində İmtahan Qərargahına daxil olan bütün şikayətlər imtahan qaydalarına uyğun olaraq operativ araşdırılıb və müvafiq qərarlar qəbul edilmişdir.

Məlum olduğu kimi, 2006-2007-ci tədris ilindən başlayaraq ADPU-da kollokvium, semestr və dövlət imtahanları test üsulu ilə aparılmışdır. 2011-2012-ci tədris ilinin yaz imtahan sessiyasından başlayaraq isə ADPU-da ikimərhələli imtahan formasından istifadə olunmuşdur. Bu qaydalara görə, test sistemi vasitəsilə imtahanın birinci mərhələsində bilikləri 70 baldan yuxarı qiymətləndirilmiş tələbələr ikimərhələli imtahanda iştirak edib-etməyəcəkləri barədə özləri qərar qəbul edirlər. "Yaxşı" və "əla" qiymət almaq istəyən tələbə Kompüter Mərkəzində test üsulu ilə imtahan verəndən sonra müvafiq düyməni basmaqla həmin gün həmin fənndən yazılı imtahana girmək imkanı qazanırdı. Bu sistemə görə, "əla" qiymət almaq istəyən tələbə eyni fəndən iki dəfə imtahan verməli olurdu. Belə ki, kompüter imtahanında yüksək bal toplayan tələbə daha yüksək qiymət almaq üçün ikinci dəfə həmin imtahanı yazılı surətdə verməli idi. Tədris prosesinin ayrılmaz parçası olan tələbələrin real biliyinin üzə çıxarılması yollarının təkmilləşdirilməsi məqsədilə cari tədrsi ilindən etibarən I kursa yeni qəbul olunan tələbələrin bilik, bacarıq və vərdişlərinin qiymətləndirilməsinin movcud sistemini təkmilləşdirmək, onun səmərəliliyini artırmaq məqsədilə aralıq yoxlamalar və yekun imtahanları yazılı formada həyata keçrilmşdir. Qeyd etmək lazımdır ki, əvvəlki illərdə qəbul olunan tələbələrin də öz arzularına əsasən test imtahanından imtina edib birbaşa yazılı imtahanlarda iştirak etmələrinə icazə verilib. Son nəticədə I tədris ili tələbələri üçün bütün fənlərdən və həmçinin yuxarı tədris ilindən olan bakalavrlar üçün öz müraciətləri əsasında onların istəyinə uyğun olaraq bəzi fənlərdən imtahanlar yazılı aparılmışdır. Qaydalara müvafiq olaraq imtahan başa çatdıqdan sonra tələbələrin yazılı cavabları İmtahan, monitorinq və qiymətləndirmə şöbəsinin bu işə məsul əməkdaşları tərəfindən kodlaşdırılmış və şöbənin müəyyən etdiyi otaqda yoxlanılmışdır. Yazıların yoxlandığı otaqlara nəzarət həyata keçirilmşdir.

Payız semestrinin imtahan sessiyasının gedişi kütləvi informasiya vasitələri nümayəndələri tərəfindən mütəmadi olaraq izlənilmiş və mətbuat orqanlarında: "Xalq qəzeti", "Azərbaycan müəllimi", "525-ci qəzet", "Palitra" və "Həftə içi" qəzetlərində, o cümlədən, AZƏRTAC.az, 525.az, Moderator.az, Palitranew.az, News.az, Axar.az, Hafta-ichi.az və Hurriyet.org saytlarında işıqlandırılmışdır.

Çıxışının sonunda dosent S.Əliyev tədris prosesinin və imtahan sessiyasının təkmilləşdirilməsi ilə bağlı təkliflərlə çıxış edib.

Elmi Şura dosent S. Əliyevin hesabatını qəbul edib.

ADPU-nun nəzdində Dissertasiya Şurasının 2014-2016-cı illəri əhatə edən fəaliyyəti haqqında Dissertasiya Şurasının sədr müavini, professor Əbülfət Pələngov çıxış edib.

Elmi Şura professor Ə.Pələngovun hesabatını qəbul edib.

ADPU-nun Kitabxana-informasiya mərkəzinin fəaliyyəti barədə Kitabxananın direktoru Azər Hüseynov məlumat verib.

Elmi Şura A.Hüseynovun hesabatını qəbul edib.

Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov cari məsələlər barədə məlumat verib və müvafiq qərarlar qəbul edilib.

Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov, professor Ələkbər Qurbanov, professor Nailə Verdizadə, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, İctimai Şuranın üzvləri, "Azərbaycan müəllimi" qəzetinin baş redaktoru Bayram Hüseynzadə, Vasif Mövsümov, Əhməd Abbasbəyli və başqaları çıxış edərək son vaxtlar ADPU-da həyata keçirilən və genişlənən təhsil islahatlarını yüksək qiymətləndiriblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov iclasa yekun vuraraq Elmi Şurada qarşıya qoyulan vəzifələrin həyata keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verib.

**Mənsur İbrahimli**

# ADPU-da “Məktəblinin dostu” layihəsinin iştirakçılarına sertifikatlar verilib

Martın 10-da Azərbaycan Respublikasının Təhsil Nazirliyi, Azərbaycan Respublikasının Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar




üzrə Dövlət Agentliyi ilə birgə həyata keçirilən “Məktəblinin dostu” pilot layihəsinin iştirakçıları olan məzun ASAN Könüllülərinə sertifaktların təqdim olunması mərasimi keçirilib. Tədbir Azərbaycanın Dövlət Himninin səsləndirilməsi ilə başlayıb.

Tədbirdə həmçinin martın 9-da Bakı-Sumqayıt yolunda baş verən yol-nəqliyyat hadisəsi nəticəsində Sumqayıt Dövlət Universitetinin həlak olmuş tələbələrinin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbirdə Təhsil nazirinin müavini Ceyhun Bayramov, Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin sədr müavini Ülvi Mehdiyev, Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri Məhəbbət Vəliyeva, ümumi təhsil məktəblərinin direktorları və digər qonaqlar iştirak ediblər.

Əvvəlcə “Məktəblinin dostu” pilot layihəsindən bəhs edən videoçarx nümayiş olunub.

Təhsil nazirinin müavini Ceyhun Bayramov bildirib ki, cari tədris ilində də təhsil sahəsində bir sıra mühüm əhəmiyyətə malik layihələr həyata keçirilib. Həmin layihələrdən biri olan “Məktəblinin dostu” Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”na əsasən həyata keçirilir.

Ceyhun Bayramov qısa müddətdə əhəmiyyətli işlərin görülməsinin layihənin ideyasının aydın olmasından və bu işə peşəkar yanaşmadan xəbər verdiyini deyib. Nazir müavini qeyd edib ki, müəllim-şagird-valideyn üçbucağında münasibətlərin daha səmərəli müstəviyə çıxarılması baxımından “Məktəblinin dostu”nun üzərinə mühüm vəzifələr düşür.

Vətəndaşlara Xidmət və Sosial İnnovasiyalar üzrə Dövlət Agentliyinin sədr müavini Ülvi Mehdiyev könüllülük fəliyyətinin əhəmiyyətindən danışaraq, könüllülük hərəkatının inkişafının, gənclərin mövcud bilik və bacarıqların daha da təkmilləşməsindəki rolunu xüsusi vurğulayıb. O, həmçinin “Məktəblinin dostu” layihəsinə məzun ASAN könüllülərinin cəlb olunması və onların bu layihəyə müsbət töhfə verməsindən məmnunluğunu ifadə edib.

Bakı şəhəri üzrə Təhsil İdarəsinin müdiri Məhəbbət Vəliyeva paytaxtın 30 ümumi təhsil müəssisəsini əhatə edən layihə üzrə 112 nəfər əməkdaşın çalışdığını bildirib. Layihə çərçivəsində indiyədək çoxsaylı tədbirlərin



keçirildiyini nəzərə çatdıran BŞTİ-nin müdiri bütün bunların məktəb mühitinin səmərəliliyini daha da artırdığını qeyd edib.

Daha sonra “ASAN Xidmət” mərkəzlərində könüllülük fəalyyətində iştirak edən “Məktəblinin dostu” seçilmiş şəxslərə sertifikatlar təqdim olunub.

Tədbirdə ASAN könüllülərinin hazırladıqları bədii kompozisiyalar nümayiş etdirilib.

Qeyd edək ki, “Məktəblinin dostu” pilot layihəsi üzrə seçilmiş şəxslər ötən ilin dekabr ayından fəaliyyətə başlayıblar.

# ADPU ilə AMİM arasında anlaşma memorandumu imzalanıb

Martın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Azərbaycan Müəllim İnkişafı Mərkəzinin (AMİM) direktoru Qrem Pollok, təhsil mütəxəssisi Bronvin Pollok, təhsil ekspertləri Asif Cahangirov və İlkin Həsənov ilə görüş keçirib. Görüşdə ADPU-nun Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev, Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Dövlət nümunəvi sənədlərlə və tələbələrlə iş bölməsinin müdiri Şəhla Gülməmmədova iştirak ediblər. Görüş zamanı ADPU ilə AMİM arasında əməkdaşlıq və məktəblərdə tədrisin keyfiyyətinin yüksəldilməsinə xidmət edən müəllimlərin inkişafı, eyni zamanda tələbə və akademik heyət üçün nəzərdə tutulan ustad dərslərin təşkili məsələləri müzakirə edilib.



Görüşdə ADPU ilə AMİM arasında anlaşma memorandumu imzalanıb. Memorandum hər iki müəssisə arasında əməkdaşlığın, faydalı proqramların, müəllimlər üçün treninqlərin keçirilməsi, layihələrin və qarşılıqlı fəaliyyətlərin inkişafı məqsədilə imzalanıb. Qeyd edək ki, ADPU-nun müəllim və tələbə heyəti üçün nəzərdə tutulan bu layihələr, proqramlar və treninqlər müasir təlim metodları çərçivəsində ibtidai sinif müəllimlərinin öyrətmə bacarıqları və strategiyalarının yüksəldilməsi, onların inkişafı və istifadəsi, müntəzəm qiymətləndirməsi, müəllimin rolu və əsas öhdəliklərinin aşılanması istiqamətində həyata keçiriləcəkdir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov və AMİM-in direktoru Qrem Pollok iki müəssisə arasında anlaşma memorandumunun bağlanılmasından məmnun qaldıqlarını bildirərək, bu əməkdaşlığın hər iki tərəf üçün faydalı olacağına inamlarını ifadə ediblər.

**Nigar Abbasova**

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağrışaqədər hazırlıq fakültəsində görüş

Martın 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov universitetin 3-cü tədris binasında fəaliyyət göstərən Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağrışaqədər hazırlıq fakültəsinin professor-müəllim heyəti və tələbə kollektivi ilə görüş keçirmişdir. Rektor Cəfər Cəfərov auditoriyalarda olaraq tələbələrlə söhbət etmiş, onların arzu və istəkləri ilə maraqlanmış, fikir və təkliflərini dinləmişdir. Rektor görüş zamanı Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağrışaqədər hazırlıq fakültəsində yeni yaradılmış kiçik zalla da tanış olmuşdur.

Fakültənin dekanı, dosent Laçın Həsənova fakültədə tədrisin təşkili, aparılan elmi-tədqiqat işləri, həyata keçirilən layihələr, ictimai-mədəni tədbirlər barədə məlumat vermişdir. Görüşdə həmçinin yeni yaradılmış Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva kafedranın həyata keçirəcəyi işlər haqqında məlumat vermişdir. Sonra fakültə müəllimlərinin və “Musiqi müəllimliyi” ixtisasında təhsil alan tələbələrin ifasında Azərbaycan və Avropa bəstəkarlarının əsərləri dinlənilmişdir.

Sonda rektor Cəfər Cəfərov görüşdən məmnun qaldığını bildirərək müəllim və tələbələrə tapşırıq və tövsiyələrini vermişdir.

**Mahirə Mustafayeva**

# 6 nömrəli məktəb-liseydə növbəti “Novruz mühazirəsi” keçirilib

Martın 3-də Təhsil Nazirliyinin tabeliyindəki 6 nömrəli məktəb-liseydə növbəti “Novruz mühazirəsi” keçirilib. Budəfəki görüşdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin dekanı, Əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor Fərrux Rüstəmovun “Keyfiyyətli və səriştəli ibtidai təhsil müəllimi hazırlığının müasir problemləri” mövzusunda mühazirəsi dinlənilib.



Mühazirədə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov, Elmi işlər üzrə prorektoru, professor Asəf Zamanov, Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev universitetin professor-müəllim heyəti, tanınmış pedaqoq alimlər, psixoloqlar, Bakı şəhərinin ümumi təhsil müəssisələrinin direktor və müəllimləri, təhsil ekspertləri və gələcək ibtidai sinif müəllimləri iştirak ediblər.

Professor Fərrux Rüstəmov mühazirəsində “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda səriştəli müəllim hazırlığı məsələlərinə xüsusi diqqət yetirildiyini, təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyinin önə çəkildiyini vurğulayıb. Qeyd edib ki, ulu öndər Heydər Əliyevin və Onun siyasi məktəbinin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin apardığı məqsədyönlü və ardıcıl dövlət siyasəti nəticəsində təhsil sahəsində aparılacaq islahatların vahid konsepsiyası, aydın strategiyası və konkret dövlət proqramı hazırlanmış, təhsilin normativ-hüquqi bazası möhkəmləndirilmiş, infrastrukturun dövrün tələbləri səviyyəsində qurulması istiqamətində praktik işlər görülmüş, 3000-dən çox məktəb binası tikilmiş, yararsız təhsil obyektləri əsaslı təmir olunmuş, ümumi təhsilin məzmunu yeniləşdirilmiş, yeni dərslik siyasəti reallaşdırılmışdır. Təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsinin yeni modeli tətbiq edilmiş, təhsil müəssisələrinin böyük əksəriyyəti informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilmiş, təhsil sisteminin informasiyalaşdırılması, xaricdə təhsil və beynəlxalq əlaqələrin genişləndirilməsi sahəsində uğurlu addımlar atılmışdır. Məktəblərin infrastrukturunun yeniləşdirilməsində Birinci vitse-prezident, Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyevanın müstəsna xidmətləri olmuşdur. Bununla yanaşı, sürətlə modernləşən respublikamızda təhsilin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi üçün yeni, daha səmərəli və təsirli addımların atılmasına ehtiyac yaranmışdır. Həmin ehtiyacların ödənilməsi, ölkədə insan kapitalının davamlı inkişafı üçün şəraitin yaradılması, mövcud infrastrukturun təkmilləşdirilməsi, müasir düşüncəyə, yeni təhsil-tərbiyə texnologiyasına, mənəvi-əxlaqi saflığa, yüksək peşə və ixtisas hazırlığına malik pedaqoji, mühəndis-pedaqoji və elmi-pedaqoji kadr hazırlığının təkmilləşdirilməsi məqsədilə dövlət başçımız İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə ”Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” təsdiq edilmışdir.

Professor F.Rüstəmov məruzəsində akademik bacarığı, tədris təcrübəsi və peşəkarlıq səviyyəsi ilə fərqlənən keyfiyyətli müəllim kadrlarının hazırlanmasının müasir modelinin məzmununu şərh



edib, müəllim əməyinin səciyyəvi xüsusiyyətləri, funksiyaları (diaqnozlaşdırma, proqnozlaşdırma, layihələşdirmə, təşkilatçılıq, nəzarətetmə, qiymətləndirmə, korreksiya, analitik və s.), müəllimin pedaqoji kompetensiyaları (öyrətmə, təşkilatçılıq, perspektiv, kommunikativ, suqqestiv, tədqiqatçılıq, elmi idrakı və s.) haqqında ətraflı məlumat verilib.

Təhsil Nazirliyində və ADPU-da müəllimlərin peşəkarlığının yüksəldilməsi sahəsində görülən işləri təqdir edən professor F.Rüstəmov ibtidai sinif müəllimi hazırlığının təkmilləşdirilməsi, pedaqoji ustalığının yüksəldilməsi ilə bağlı maraqlı təkliflərlə çıxış edib.

ADPU-nun “İbtidai sinif müəllimliyi” ixtisasının tələbələrinin ifasında səslənən “Əziz müəllimim” mahnısı tədbir iştirakçılarında xoş əhval-ruhiyyə yaratmışdır. Tədbirdə Azərbaycan Təhsil Şurasının sədri, professor Əjdər Ağayev, Azərbaycan Respublikası Təhsil İnstitutunun direktor müavini, dosent Ənvər Abbasov, tanınmış təhsil eksperti, fəlsəfə doktoru Etibar Əliyev məruzə ətrafında çıxışlar etmiş və onu yüksək dəyərləndirmişlər.

Tədbirin sonunda təhsil ekspertlərinin, ümumi təhsil məktəb müəllimlərinin və gələcək müəllimlərin müəllim kadrları hazırlığı ilə bağlı sualları professor F.Rüstəmov tərəfindən geniş cavablandırılmışdır.

Tədbiri məktəb-liseyin direktoru, moderator Gülşən Orucova yekunlaşdırmış, ADPU-nun müvafiq strukturları ilə 6 nömrəli məktəb arasında mövcud əlaqələrdən bəhs etmiş, gələcək müəllimlərin həmin məktəbdə mentor kimi işləmələrini təklif etmişdir.

**İctimaiyyətlə əlaqələr şöbəsi**

# Məktəb direktorları ilə görüş

Martın 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev məktəbinin lektoriyasında Bakı şəhərinin ümumi təhsil məktəblərinin direktorları ilə görüş keçirilib. Görüşdə ADPU-nun rəhbərliyi, fakültə dekanları iştirak ediblər. Görüşün keçirilməsində məqsəd ADPU-da keçirilməsi nəzərdə tutulan "Açıq qapı günü"nün vaxtını, forma və məzmununu müəyyən etmək, eləcə də əməkdaşlıq əlaqələri ilə bağlı fikir mübadiləsi aparmaq olub.

Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov qonaqları salamlayaraq belə görüşlərin mütəmadi keçirilməsinin vacibliyini bildirib. Belə görüşlər fikir və təcrübə mübadiləsi baxımından mühüm əhəmiyyət kəsb edir. Ali məktəblə orta məktəblər arasında əməkdaşlıq əlaqələri genişləndirilməli, bu əlaqələrin keyfiyyəti yüksəldilməlidir. İkitərəfli əlaqələrin genişləndirilməsi təlim-tərbiyənin, tədrisin keyfiyyətinin yüksəldilməsinə kömək edər. ADPU ölkəmizdə müəllim hazırlığının mərkəzi hesab edilir. Biz vahid bir prosesin tərkib hissəsi olaraq şəbəkə yaratmalı, güclü müəllim potensialı formalaşdırmalıyıq. Bilikli, savadlı, bacarıqlı gənclərin ADPU-ya cəlb edilməsinə böyük əhəmiyyət veririk. Hazırda ADPU-da "Ustad dərsləri" layihəsi həyata keçirilir. "Ustad dərslər" layihəsində ümumi təhsil məktəblərində çalışan, iş təcrübəsi və tədris nəticələri ilə fərqlənən müəllimlərin tədris etdikləri fənlər üzrə universitetimizdə uyğun fənnin tədrisi metodikasından ustad dərsləri aparmaları nəzərdə tutulur. Layihəyə qabaqcıl təcrübəsi, yaradıcı fəaliyyəti, innovativ düşüncə tərzi ilə ölkə pedaqoji mühitində tanınan, ümumi təhsil orta məktəb müəllimlərinin mövcud bazasında adları yer alan, əməkdar müəllimlər, 2008-2015-ci illərdə keçirilmiş "Ən yaxşı müəllim" müsabiqəsinin qalibləri, orta məktəb müəllimlərinin diaqnostik qiymətləndirməsi zamanı yüksək nəticələr əldə edən, müxtəlif təltiflərə layiq görülən, həmçinin "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xaricdə təhsil üzrə Dövlət Proqramı" üzrə təhsil almış müəllimlər cəlb ediliblər. Bu layihə çərçivəsində paytaxtın tanınmış məktəblərinin qabaqcıl müəllimləri yeni təlim metodları əsasında ADPU-da ustad dərsləri keçirlər.



Rektor qeyd edib ki, bu gün respublikamızda müəllim hazırlığına xüsusi diqqət yetirilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev yüksək hazırlıqlı peşəkar pedaqoji kadrların hazırlanmasını vacib bir vəzifə kimi bizim qarşımıza qoyub. Təhsil Nazirliyi cəmiyyətdə müəllim peşəsinin nüfuzunun yüksəldilməsi, pedaqoji fəaliyyətinin stimullaşdırılması üçün davamlı və səmərəli fəaliyyət göstərir. Təhsil Nazirliyi tərəfindən 2014-2015-ci tədris ilində "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və 500-dən yuxarı bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur. Onlara əlavə 100 manat təqaüd verilir. Builki tədris ilində 500 və 500-dən yuxarı bal toplayıb ADPU-nu seçənlərin sayı 117 nəfərdir. Müqayisə üçün qeyd edək ki, 2014-2015-ci tədris ilində bu rəqəm 18 olub. Bunun səbəbi ölkəmizdə müəllim peşəsinə maraqın artması ilə izah edilir. Azərbaycanda həm də orta məktəb müəllimlərinin bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi həyata keçirilib. Bu da təbii ki, müəllim əməyinin və pedaqoji fəaliyyətin stimullaşdırılmasına xidmət edən mühüm bir addımdır.

Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov, Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Fizika və texnologiya fakültəsinin dekanı, fizika-riyaziyyat üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov, 149 nömrəli tam orta məktəbin direktoru Rəhilə Baxşıyeva, 83 nömrəli məktəb-liseyin direktoru Nəbi Mahmudov, 328 nömrəli tam orta məktəbin direktoru Asif Nəbiyev, 315 nömrəli tam orta məktəbin direktoru Dadaş Əliyev, 19 nömrəli tam orta məktəbin direktoru Akif Əliyev, 188 nömrəli tam orta məktəbin direktoru Sabir Mahmudov və başqaları çıxış edərək müəllimlərin bilik və peşəkarlıq səviyyəsinin yüksəldilməsi, informasiya-kommunikasiya texnologiyaları sahəsində bacarıqlarının artırılması, müasir tələblərə cavab verən yeni dərsliklərin yazılması, pedaqoji təcrübənin səmərəli təşkili, şagirdlərin elmi araşdırmalara cəlb edilməsi ilə bağlı fikir və təkliflərini bölüşüblər. Sonda aprelin 15-də ADPU-da "Açıq qapı günü" keçirilməsi qərara alınıb.

**Nigar Zülfüqarqızı**

# Dissertasiya Şurasının üzvləri ilə görüş

Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov ADPU-nun nəzdində fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunan dissertasiyaların müdafiəsini keçirən FD.02.061 Dissertasiya Şurasının yeni üzvləri ilə görüşüb.





Görüşü giriş sözü ilə açan rektor Cəfər Cəfərov bildirib ki, FD.02.061 Dissertasiya Şurasının yeni tərkibi Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 3 mart 2017-ci il tarixli 38 nömrəli əmri ilə təsdiq edilib. FD.02.061 Dissertasiya Şurasında "Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (Riyaziyyatın tədrisi metodikası, Tarixin tədrisi metodikası, Azərbaycan dilinin tədrisi metodikası)"- pedaqogika elmləri, "Ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi"- pedaqogika elmləri, "Korreksiya pedaqogikası"-pedaqogika elmləri ixtisasları üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunan dissertasiyaların müdafiəsi keçirilir. Dissertasiya Şurasının tərkibinə ADPU-nun tanınmış və nüfuzlu 25 nəfər alimi daxildir. Dissertasiya Şurasının sədri universitetin rektoru, tarix üzrə elmlər doktoru, professor Cəfər Cəfərov, sədr müavini Elmi işlər üzrə prorektor, fizika-riyaziyyat elmləri doktoru, professor Asəf Zamanov, elmi katibi Fizika və onun tədrisi metodikası kafedrasının dosenti, pedaqogika üzrə elmlər doktoru İsa İsmayılovdur. Elmi seminarın sədri isə professor Əbülfət Pələngovdur. Dissertasiya Şurasının səlahiyyət müddəti 15 dekabr 2018-ci ilədək müəyyən edilib.

Rektor Dissertasiya Şurasının üzvlərini təbrik edib və onlara uğurlar arzulayıb.

Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov və Elmi katib, dosent İsa İsmayılov çıxış edərək Dissertasiya Şurasının fəaliyyəti ilə bağlı öz fikir və təkliflərini bildiriblər.

Sonda rektor Cəfər Cəfərov Dissertasiya Şurasına təqdim edilən dissertasiya işlərinin keyfiyyətinə tələblərin artırılmasını və plagiatla prinsipial mübarizə aparmağı tapşırıb.

**Könül Nəzərova**

# ADPU-da əməkdaşlıq məsələləri müzakirə edilib

Martın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Gürcüstan Respublikasının Qafqaz Universitetinin rektoru, Universitet Prezidentləri Beynəlxalq Assosiasiyasının yeni seçilmiş sədri Kaxa Şengeliya ilə görüşüb. Görüşdə ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə iştirak edib.



Rektor Cəfər Cəfərov görüş zamanı rəhbərlik etdiyi ali təhsil müəssisəsi haqqında məlumat verərək bildirib ki, ADPU-nun tərkibində 5 filial və Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) fəaliyyət göstərir. Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb isə ADPU-nun baza məktəbidir. Tədris 4 korpusda aparılır. ADPU-nun 20 minə yaxın tələbəsi var.

Universitetin fəaliyyət istiqamətləri, həyata keçirilən islahatlar, yeniliklər, layihələr və beynəlxalq əlaqələr barədə danışan rektor bildirib ki, kafedralarda tədris olunan fənlər üzrə professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün müsabiqə elan edilib. Müsabiqənin keçirilməsində məqsəd ADPU-da şəffaf və obyektiv təhsil mühitinin yaradılması, yeniliyin və müasirliyin təmin edilməsi, qabaqcıl beynəlxalq təcrübənin öyrənilərək tətbiq olunması, müasir tələblərə cavab verən, dərin elmi biliyə, geniş dünyagörüşünə, zəngin erudisiyaya, yüksək mənəvi keyfiyyətlərə malik rəqabətqabiliyyətli mütəxəssisləri işə cəlb etməkdir. Müsabiqəyə 114 vakant yer çıxarılıb. Bununla yanaşı, universitetdə tyutorların, tədris-yardımçı heyətin və Kitabxana-informasiya mərkəzinin əməkdaşlarının attestasiyası keçirilir. Attestasiyaya ümumilikdə 150-dən çox şəxs cəlb edilib. Məqsəd onların peşəkarlıq səviyyəsinin müəyyən edilməsidir.

Qafqaz Universitetinin rektoru, Universitet Prezidentləri Beynəlxalq Assosiasiyasının sədri Kaxa Şengeliya səmimi və qonaqpərvər münasibətdən məmnun qaldığını bildirərək Universitet Prezidentləri Beynəlxalq Assosiasiyası barədə məlumat verib. Bildirib ki, Universitet Prezidentləri Beynəlxalq Assosiasiyası 1965-ci ildə Birləşmiş Millətlər Təşkilatının yanında yaradılıb. Dünyanın 200-dən çox qabaqcıl və nüfuzlu universiteti bu Assosiasiyanın üzvüdür. Assosiasiyanın əsas mərkəzləri ABŞ-ın Nyu-York şəhərində və Böyük Britaniyanın paytaxtı London şəhərində yerləşir. Kaxa Şengeliya rektor Cəfər Cəfərovu Universitet Prezidentləri Beynəlxalq Assosiasiyasının 5-8 iyul 2017-ci ildə Avstriyanın paytaxtı Vyana şəhərində keçiriləcək toplantısına dəvət edib.

Görüşdə ali təhsil sahəsində qabaqcıl beynəlxalq təcrübənin tətbiqi, ali təhsilin yeni keyfiyyət standartları, intellektual resurslardan səmərəli istifadə və gələcəkdə əməkdaşlıq əlaqələrinin genişləndirilməsi məsələləri müzakirə olunub.

Sonda xatirə şəkli çəkdirilib.

# Filologiya fakültəsində Feyzulla Qasımzadənin kitabının yeni nəşrinin təqdimatı keçirilmişdir

17 mart 2017-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Feyzulla Qasımzadənin "XIX əsr Azərbaycan ədəbiyyatı" adlı monumental kitabının yeni nəşrinin təqdimatı keçirilmişdir.



Təqdimatda ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Elmi işlər üzrə prorektoru, professor Asəf Zamanov iştirak etmişlər. Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov



an Bakı Dövlət Universitetinin (BDU) professoru Yeganə İsmayılova, dərsliyin rəyçisi filologiya üzrə fəlsəfə doktoru Məti Bayramlı çıxış edərək Feyzulla Qasımzadənin elmi-pedaqoji fəaliyyəti, bənzərsiz müəllim şəxsiyyəti, sanballı elmi əsərləri barədə, monoqrafik tədqiqatları, o cümlədən "XIX əsr Azərbaycan ədəbiyyatı" dərsliyinin elmi-nəzəri sanbalı və siqləti haqqında fikir mübadiləsi aparmışlar.

görkəmli alimin Azərbaycan ədəbi-elmi fikrindəki mövqeyi, ədəbiyyat tarixçisi kimi səmərəli fəaliyyəti və ədəbiyyatşünaslığa misilsiz xidmətləri haqqında müfəssəl məlumat vermişdir. Tədbirdə Azərbaycan və dünya ədəbiyyatının kafedra müdiri, professor Himalay Qasımov, həmin kafedranın professorları Tərlan Novruzov, Təyyar Salamoğlu, həmçinin kitabı nəşrə hazırlay-

Tədbirin sonunda Feyzulla Qasımzadənin qızı, ADPU-nun dosenti Nigar Qasımova tədbir təşkilatçılarına, dərsliyin yeni nəşrində əməyi olanlara və iştirakçılara dərin minnətdarlığını bildirmişdir.

**Nurlan Səmədov**

# Novruz şənliyi

Martın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Baharın gəlişi və ilaxır çərşənbəyə həsr olunan “Novruz çərşənbəsi” adlı bayram şənliyi keçirilib. Bayram şənliyində ADPU-nun rəhbərliyi, müəllim və tələbələri, millət vəkilləri Aydın Mirzəzadə, Adil Əliyev, Əməkdar elm xadimi, professor Şahlar Əsgərov, Təhsil Şurasının sədri, professor Əjdər Ağayev iştirak ediblər. Bayram şənliyində əvvəlcə tələbələrin Novruz bayramına həsr etdikləri rəsm sərgisinə və bayram xonçalarına baxış keçirilib.

Bayram şənliyində “Azərbaycan kinofilmlərinə səyahət” adlı konsert proqramı təqdim edilib. Konsert proqramında Azərbaycanın müxtəlif kinofilmlərindən fraqmentlər nümayiş etdirilib. Milli geyimdə olan tələbələrin musiqi sədaları altında Novruz bayramı ilə əlaqədər hazırladıqları şeirlər, səhnələr, ifa etdikləri rəqslər, bayramın rəmzlərindən və adətlərindən olan səməni, xonça, eyni zamanda Novruz personajları Kosa, Keçəl və Bahar qızın şən zarafatları tədbir iştirakçılarına xoş ovqat bəxş edib. Xalq artisti Zabit Nəbizadənin ifasında səslənən mahnılar tədbirə xüsusi rəng qatıb. Tələbələrin Novruz bayramına həsr etdikləri bayram xonçalarına baxış keçirilib və ən yaxşı xonçanın sahibi müəyyən edilib. Qeyd edək ki, xonça yarışında Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin tələbələri qalib gəliblər.





ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbir iştirakçılarını bayram münasibətilə təbrik edib, cansağlığı və uğurlar arzulayıb. Bildirib ki, Azərbaycanın qarşısında yeni çağırışlar, yeni hədəflər dayanır. Rektor tələbələrə müraciət edərək bu çağırış və hədəflərə cavab vermək üçün yaxşı oxumağı, Vətənimiz, xalqımız, millətimiz, dövlətimiz üçün layiqli vətəndaş, yüksək səviyyəli müəllim kimi yetişməyi tövsiyə edib.

Bədii-musiqili hissədən sonra universitetin həyətində Novruz tonqalı alovlandırılıb. Tələbə-gənclər tonqal ətrafında dövrə vuraraq rəqs edib, maraqlı konsert proqramı ilə çıxış ediblər. Bayram şənliyi universitetin kollektivinin böyük sevincinə səbəb olub.

**Mahirə Məhərrəmqızı**

# “Yurdumuza bahar gəlir” adlı bayram şənliyi

Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşəbbüsü və təşkilatçılığı ilə universitetin 2 nömrəli tədris binasında Novruz bayramı münasibətilə “Yurdumuza bahar gəlir” adlı bayram şənliyi keçirilib. Bayram şənliyində ADPU-nun rəhbərliyi, müəllim və tələbələri, Gənclər və idman nazirinin müavini İntiqam Babayev, Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının sədri, millət vəkili Şahin İsmayılov, Milli Məclisin Gənclər və idman komitəsinin sədri Fuad Muradov və digər tanınmış şəxslər iştirak ediblər. Bayram şənliyindən öncə qonaqlar tədris binasındakı Heydər Əliyev Mərkəzi ilə tanış olublar. ADPU-nun rektoru, professor Cəfər Cəfərov onlara Mərkəzin fəaliyyəti barədə məlumat verib. Sonra tədbir akt zalında davam etdirilib.






Bayram şənliyində tələbələr Azərbaycan milli kinosunun nadir incilərindən sayılan “Arşın mal alan”, “O olmasın, bu olsun” filmlərindən müxtəlif səhnəcikləri nümayiş etdiriblər. Novruzun adətənənələrindən olan papaqatdı ilə bağlı videoçarx nümayiş etdirilib. Novruz personajları olan Kosa və Keçəlin şən zarafatları, Bahar qızın şeirləri, rəqsləri, tələbələrin ifa etdikləri şeirlər, səhnələr, milli və xarici rəqslər, “Bayram gəlir elimə”, “Azərbaycan-anaların anası” nəğmələri, “Sarı gəlin” rəqsi, həmçinin TGT-nin “Şən və hazırcavablar klubu”nun təqdim etdiyi tamaşa iştirakçılarda xoş əhval-ruhiyyə yaradıb.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək tədbir iştirakçılarını bayram münasibətilə təbrik edib, onlara ən xoş, ən səmimi arzularını bildirib.

Sonra həyətdə Novruz tonqalı alovlandırılıb. Tələbə-gənclər tonqal ətrafında rəqs ediblər.

**Könül Nərimanqızı**

# Kimya və biologiya fakültəsinin Novruz şənliyi

Martın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Böyük Akt zalında Novruz şənliyi keçirilib. Novruz şənliyində ADPU-nun rəhbərliyi, fakültənin müəllim və tələbələri iştirak ediblər. Kimya və biologiya fakültəsinin dekanı, dosent Elnarə Mehbalıyeva çıxış edərək başda ADPU-nun rektoru, professor Cəfər Cəfərov olmaqla, tədbir iştirakçılarını Novruz bayramı münasibətilə təbrik edib, cansağlığı və uğurlar arzulayıb. Tədbirdə Novruz adətənənələrindən, ilaxır çərşənbələrindən danışılıb, Novruzun sülh, qardaşlıq, həmrəylik bayramı olduğu vurğulanıb. Tədbirdə ulu öndər Heydər Əliyevin, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin və Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyevanın Novruz bayramı şənliklərində iştiraklarını əks etdirən slayd göstərilib. Bahar qızın bayram təbriki, Kosa və Keçəlin şən zarafatları, tələbə-gənclərin ifa etdikləri “Lalə” və “Sarı gəlin” rəqsləri, “Azərbaycan” mahnısı, yumoristik səhnələr, vətənpərvərlik mövzusunda səsləndirilikləri şeirlər hamıda xoş ovqat yaradıb.





# Türkiyənin Azərbaycandakı səfiri Erkan Özoral ADPU-da olub

Martın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov Türkiyə Respublikasının Azərbaycan Respublikasındakı fövqəladə və səlahiyyətli səfiri cənab Erkan Özoralla görüşüb.



Görüşdə Türkiyənin Azərbaycandakı səfirliyinin Təhsil müşaviri cənab Abdulqafur Büyükfırat, universitetin Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə, Ümumi işlər üzrə prorektoru Əbdül Xalıqov iştirak ediblər.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov görüşün keçirilməsindən məmnun qaldığını bildirərək yüksək səviyyədə inkişaf edən Türkiyə-Azərbaycan münasibətlərinin bütün Türk dünyası üçün layiqli nümunə olduğunu qeyd edib. Qonaqlara rəhbərlik etdiyi ali təhsil müəssisəsi haqqında məlumat verən rektor bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu ADPU-ya qoşulub. Bu qoşulma prosesi tam başa çatıb. Hazırda ADPU-nun tərkibində 5 filial və Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) fəaliyyət göstərir. Universitetdə 8 fakültə, 39 kafedra var. ADPU-da 20 minə yaxın tələbə təhsil alır. Təhsil naziri cənab Mikayıl Cabbarovun müvafiq əmri ilə Bakı şəhərindəki Məmməd Rahim adına 7 nömrəli tam orta məktəb 2016-2017-ci tədris ilindən ADPU-nun baza məktəbi müəyyən edilib. Bundan başqa, ADPU-ya Bakı şəhərinin 30-dan çox orta məktəbinin qabaqcıl müəllimləri cəl edilib və onlar universitetdə ustad dərsləri keçirlər. Tədris 4 korpusda aparılır. Universitetdə "Təhsildə sosial-psixoloji xidmət", "Korreksiyaedici təlim", "Məktəbəqədər təlim və tərbiyə", "İbtidai sinif müəllimliyi" ixtisasları üzrə 200-ə yaxın türkiyəli tələbə təhsil alır. Türkiyəli tələbələr universitetin ictimai-mədəni həyatında fəal iştirak edirlər. Universitetdə "Türk araşdırmaları" elmi -tədqiqat mərkəzi, Türk odası, Əcnəbi tələbələrlə iş üzrə şöbə və türkiyəli tələbələrin İdarə Heyəti fəaliyyət göstərir.

Universitetdə təhsilin məzmununun yenilənməsi, tədrisin keyfiyyətinin yüksəldilməsi, idarəetmənin optimallaşdırılması, maddi-texniki bazanın, elmi-pedaqoji kadr potensialının və kitabxananın fəaliyyətinin gücləndirilməsi barədə danışan rektor bildirib ki, kafedralarda tədris olunan fənlər üzrə professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün müsabiqə elan edilib. Müsabiqənin keçirilməsində məqsəd ADPU-da şəffaf və obyektiv təhsil mühitinin yaradılması, müasir tələblərə cavab verən rəqabətqabiliyyətli mütəxəssisləri işə cəlb etməkdir. Müsabiqəyə 114 vakant yer çıxarılıb. Universitetdə tyutorların, tədris-yardımçı heyətin və Kitabxana-informasiya mərkəzinin əməkdaşlarının da attestasiyası keçirilir. Attestasiyaya ümumilikdə 150-dən çox şəxs cəlb edilib. Məqsəd onların peşəkarlıq səviyyəsinin müəyyən edilməsidir. Eyni zamanda ADPU-nun yeni, müasir dərslik və dərs vəsaitləri ilə təmin edilməsinə, tələbələrin xarici dil öyrənmələrinə ciddi diqqət yetirilir. Rektor qeyd edib ki, ADPU beynəlxalq əlaqələrin genişləndirilməsinə, mübadilə proqramlarında iştirak etməyə böyük əhəmiyyət verir və bu istiqamətdə məqsədyönlü addımlar atır. Türkiyə universitetləri ilə əlaqələrin genişləndirilməsinə xüsusi önəm verilir.

Səfir Erkan Özoral səmimi və mehriban görüşdən razı qaldığını bildirərək ADPU-da təhsil alan türkiyəli tələbələrə göstərilən diqqət və qayğıya görə universitetin rəhbərliyinə təşəkkür edib. Görüşdə xatirə şəkli çəkdirilib.

Sonra səfir Türkiyə İnkişaf və Əməkdaşlıq İdarəsinin (TİKA) nümayəndələri ilə birlikdə "Türk araşdırmaları" elmi-tədqiqat mərkəzi, Türk odası, Əcnəbi tələbələrlə iş üzrə şöbənin və türkiyəli tələbələrin İdarə Heyətinin fəaliyyəti ilə tanış olub. Daha sonra səfir Erkan Özoral və Təhsil müşaviri Abdulqafur Büyükfırat türkiyəli tələbələrlə görüşüblər. Onlar tələbə-gənclərə yaxşı oxumağı, xalqı, Vətəni sevməyi, Türkiyənin və Azərbaycanın milli maraqlarını üstün tutmağı tövsiyə ediblər. Görüşdə tələbələrin arzu və istəkləri dinlənilib, sualları cavablandırılıb.

# "Pedaqoji təhsil: Universitet və məktəb əlaqələri" mövzusunda dəyirmi masa

Martın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və Azərbaycan Respublikasının Təhsil İnstitutunun birgə təşkilatçılığı ilə universitetdə "Pedaqoji təhsil: Universitet və məktəb əlaqələri" mövzusunda dəyirmi masa keçirilib. Dəyirmi masada ADPU-nun və Təhsil İnstitutunun rəhbərliyi, Təhsil Nazirliyinin və Bakı Şəhəri üzrə Təhsil İdarəsinin əməkdaşları, fakültə dekanları, universitetin pedaqogika, psixologiya və metodika kafedralarının müdirləri, ADPU-da fəaliyyət göstərən İctimai Şuranın üzvləri, ali təhsil müəssisələrinin kafedra müdirləri, Bakı şəhərinin ümumi təhsil məktəblərinin direktorları iştirak ediblər.



Dəyirmi masanı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, belə dəyirmi masaların keçirilməsi fikir və təcrübə mübadiləsinin aparılması baxımından mühüm rol oynayır. Belə tədbirlər bir platforma rolunu oynayaraq əməkdaşlıq əlaqələrimizin genişlənməsinə və təhsil sahəsində qarşımıza qoyduğumuz məqsədlərə, hədəflərə çatmağımıza zəmin yaradır. Biz universitet və orta məktəblər arasında əməkdaşlıq əlaqələrinin inkişaf etdirilməsi, bu işin metodika və metodologiyasının təkmilləşdirilməsi, bütövlükdə təhsilin, xüsusilə də, pedaqoji təhsilin keyfiyyətinin yüksəldilməsi üçün birgə səmərəli fəaliyyət göstərməliyik.

Dəyirmi masada çıxış edən Təhsil Nazirliyinin Təhsilin inkişafı proqramları şöbəsinin müdiri, Təhsil İnstitutunun direktoru vəzifəsini icra edən Emin Əmrullayev belə tədbirlərin ali təhsil müəssisələri ilə ümumi təhsil məktəbləri arasında əlaqələrin genişləndirilməsinə səmərəli təsir etdiyini bildirib və dəyirmi masa iştirakçılarına uğurlar arzulayıb.

Dəyirmi masanın moderatoru, ADPU-nun Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev qeyd edib ki, biz müasir dünyanın təhsil sahəsində qarşıya qoyduğu çağırış və tələblərə cavab verməli, orta məktəblər üçün yüksək bilik səviyyəsinə malik mütəxəssislər hazırlamalıyıq.

Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktor müavini, dosent Ənvər İmanov slayd vasitəsilə "Universitet və məktəb əlaqələrinin mövcud vəziyyəti, problemlər və ideyalar" mövzusunda təqdimatla çıxış edib. Bildirib ki, təhsilin müasirləşdirilməsi qabaqcıl texnologiyaların və idarəetmə üsullarının, innovasiyaların tətbiqi ilə bağlıdır. İnsan resurslarını müasirləşdirmək, innovativ təlim metodlarının tətbiqi, səriştəli təhsilverənlərin formalaşdırılması əsas strateji istiqamətlərdir. Müəllim hazırlığı baxımından davamlı universitet-məktəb əlaqələrinin yaradılması, müəllim hazırlığı prosesində pedaqoji təcrübələrin səmərəli təşkili, universitetdə müəllim hazırlığı üzrə standart və kurikuluma daxil olan fənn proqramlarının məktəb fənn proqramları ilə uyğunlaşdırılması, universitetdə ümumtəhsil məktəb müəllimlərinin istiqamətlər üzrə əlavə təhsilinin təşkili, universitetin filiallarının bazalarından istifadə etməklə orta məktəblərdə təlimin metodları və məzmununun yenilənməsi üçün regionlarda elmi-praktik konfransların keçirilməsi, xüsusi qabiliyyətli şagirdlərin aşkara çıxarılması, tədris-metodik resursların hazırlanması işinə ümumtəhsil məktəblərinin qabaqcıl müəllimlərinin cəlb edilməsi və ustad dərslərinin davam etdirilməsi vasitəsilə orta məktəb müəllimlərinin universitetin tədris prosesinə cəlb olunması, şagirdlərdə müəllim peşəsinə həvəs yaratmaq məqsədilə universitetin tanınmış alim-pedaqoqları ilə məktəblilərin görüşlərinin mütəmadi təşkil olunması, Təhsil İnstitutu ilə birgə pedaqoji eksperimentlərin aparılması vacib vəzifələrdir.

Səmərəli və işgüzar şəraitdə keçən dəyirmi masada Tədris işləri üzrə prorektor, professor Malik Cəbrayılov, ADPU-nun nəzdində fəaliyyət göstərən Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin direktor müavini Hüseyn Əsgərov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva, Fizikanın tədrisi metodikası kafedrasının müdiri, dosent Razim Abdurazaqov, Təhsil İnstitutunun direktor müavini Ənvər Abbasov, Azərbaycan Dillər Universitetinin dosenti Vidadi Bəşirov, Zərifə Əliyeva adına Liseyn direktoru Mehriban Vəliyeva, 132-134№-li Təhsil Kompleksinin direktoru Sara Xanlarova, 19 №-li tam orta məktəbin direktoru Akif Əliyev, təhsil eksperti, fəlsəfə doktoru Etibar Əliyev çıxış ediblər. Çıxışlarda ali məktəblərlə orta məktəblərin birgə layihələr həyata keçirməsi, tələbə-gənclərin orta məktəblərə cəlb edilməsi, şagirdlər üçün ali məktəblərdə "Açıq qapı günləri"nin yeni formatda keçirilməsi, universitet və məktəb əlaqələrində tədris-pedaqoji fəaliyyət istiqamətləri, ali məktəblərlə orta məktəblərin vahid şəbəkə əsasında fəaliyyət göstərməsi, qabaqcıl dünya təcrübəsinin tətbiqi, xarici universitetlərlə müəllim mübadiləsinin aparılması, cəmiyyətdə müəllim peşəsinin nüfuzunun yüksəldilməsi, 12 illik təhsilə keçidin müsbət cəhətləri, informasiya-kommunikasiya texnologiyalarının təlim-tərbiyə, tədris prosesinə tətbiqinin genişləndirilməsi, pedaqoji kadr hazırlığına, dərslik və dərs vəsaitlərinə tələblərin yüksəldilməsi, şagird və tələbələrdə mütaliə mədəniyyətinin və elmi biliklərin formalaşmasının vacibliyi ilə bağlı maraqlı fikir və təkliflər səsləndirilib. Bu mövzuda dəyirmi masaların davamlı keçirilməsi üçün ADPU və Təhsil İnstitutunun əməkdaşlarından ibarət komissiyanın yaradılması qərara alınıb.

Dəyirmi masaya yekun vuran ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Təhsil Nazirliyinin Təhsilin inkişafı proqramları şöbəsinin müdiri, Təhsil İnstitutunun direktoru vəzifəsini icra edən Emin Əmrullayev səslənən səmərəli və dəyərli təkliflərin təcrübəyə tətbiq edilməsinin vacibliyini vurğulayıblar.

**"Gənc müəllim"**

# “Vətən oğulları” adlı ədəbi-bədii tədbir

Martın 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin təşəbbüsü və təşkilatçılığı ilə Böyük Akt zalında Azərbaycan və ingilis dillərində 31Mart-Azərbaycanlıların Soyqırımı Gününə həsr edilən



“Vətən oğulları” adlı ədəbi-bədii tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, müəllim və tələbələri iştirak ediblər. Tədbir iştirakçıları öncə azərbaycanlıların soyqırımını əks etdirən kitab sərgisi ilə tanış olublar. Tədbirdə milli hərbi geyimli tələbə oğlan və qızlar Azərbaycanın Dövlət Himnini oxuyublar. Qeyd edək ki, Filologiya fakültəsi tələbələrinin hazırladıqları “Vətən oğulları” adlı ədəbi-bədii tədbirdə tarixi keçmişimizlə bu günümüz arasında bir körpü yaradılıb. Azərbaycan xalqının böyük dövlət və hərbi xadimləri Cavanşir, Babək, Şəmsəddin Eldəniz, Şah İsmayıl Xətai ilə bağlı məlumatlar səsləndirilib. Tələbələr Xalq şairləri Bəxtiyar Vahabzadənin, Xəlil Rzanın, Zəlimxan Yaqubun, Qabilin və digər böyük söz ustadlarımızın tariximizi, milli varlığımızı, azadlıq, müstəqillik duyğularımızı, dövlət rəmzlərimizi, vətənpərvərliyi, qələbəyə olan inamımızı təbliğ edən şeirlərini səsləndiriblər, Qarabağ müharibəsini, Xocalı soyqırımını əks etdirən səhnələr ifa ediblər. Qeyd edilib ki, 1813-cü ilin Gülüstan və 1828-ci ilin Türkmənçay sülh müqavilələrindən sonra Azərbaycan iki yerə bölünüb. Azərbaycan ərazisində düşünülmüş şəkildə ermənilər məskunlaşdırılıb. Namərd və xain ermənilər isə tarix boyu, xüsusilə də, son iki əsrdə xalqımıza qarşı dəhşətli faciələr, soyqırımları, terror aktları törədib. Ermənilərin xalqımıza qarşı törətdikləri vəhşiliklərin arasında 1918-ci ilin mart hadisələri xüsusi amansızlığı və qəddarlığı ilə seçilir. 1918-ci ilin mart hadisələri zamanı azərbaycanlıların ermə-




nilər tərəfindən kütləvi surətdə qırılması halı baş vermişdir. Belə ki, ermənilər 1918-ci il martın 31-dən aprelin 2-nə qədər Bakıda 17000, Şamaxıda isə 8000-dən çox dinc azərbaycanlı sakini xüsusi qəddarlıqla qətlə yetirmişlər. Qətlə yetirilənlərdən 2500 nəfərdən çoxu qadın, 200-ü isə uşaq olmuşdur. Bütövlükdə 1918-ci ilin mart hadisələri zamanı ermənilər 50 mindən çox azərbaycanlını öldürmüş, 10 mindən çox insanı isə öz yaşayış yerlərini qoyub qaçmağa məcbur etmişlər. Erməni vandalistləri eləcə də Qubada, Lənkəranda, Dağlıq Qarabağda, Qərbi Azərbaycanda, Naxçıvanda və Azərbaycanın digər bölgələrində 10 minlərlə dinc mülki vətəndaşı qətlə yetirmişlər. 10 il bundan öncə aşkar edilmiş Quba Soyqırımı Memorial Xatirə Kompleksi də 1918-ci ildə baş vermiş erməni vəhşiliklərinin əyani sübutudur. Erməni təcavüzkarları bu gün də Azərbaycana qarşı işğalçılıq və terror siyasətini həyata keçirməkdə davam edirlər.

Digər milli facilərimiz kimi, ermənilərin öz himayədarlarının köməkliyi ilə 1918-ci ilin martında xalqımıza qarşı törətdikləri soyqırımına da yalnız ümummilli liderimiz Heydər Əliyevin təşəbbüsü və birbaşa rəhbərliyi ilə dolğun və hərtərəfli siyasi-hüquqi qiymət verilmişdir. Ulu öndər Heydər Əliyevin 1998-ci il martın 26-da imzaladığı 690 saylı fərmanla 31 Mart dövlət səviyyəsində Azərbaycanlıların Soyqırımı Günü elan edilmişdir.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev birmənalı şəkildə bildirib ki, Qarabağ münaqişəsi yalnız xalqımızın milli maraqları çərçivəsində, beynəlxalq hüququn norma və prinsipləri əsasında həll ediləcəkdir. Azərbaycan öz ərazisində “ikinci erməni dövləti”nin yaradılmasına əsla imkan verməyəcəkdir.

Tədbirin sonunda Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov çıxış edərək belə tədbirlərin tələbə-gənclərin tariximizi dərindən öyrənmələrində, milli ruhda, əsl vətəndaş kimi tərbiyə olunmalarında mühüm rol oynadığını bildirib, tədbirin keçirilməsinə görə müəllim və tələbələrə öz təşəkkürünü bildirib.

**“Gənc müəllim”**

# Magistratura və doktorantura şöbəsində konfrans

Martın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Magistratura və doktorantura şöbəsində II tədris ili



magistrantlarının elmi-pedaqoji təcrübəsinin yekunu və elmi-tədqiqat təcrübəsinin başlanma-




sı ilə bağlı konfrans keçirildi. Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov konfransı açaraq elmi-pedaqoji təcrübənin yekunları ilə bağlı məlumat verdi. Sonra 27 mart-21 aprel tarixlərində keçiriləcək elmi-tədqiqat təcrübəsi ilə əlaqədar qarşıda duran vəzifələri izah etdi.

Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayev, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Yaqut Rzayeva, İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının dosenti Məlikməmməd Məmmədov çıxış edərək elmi-pedaqoji təcrübənin gedişi və görülmüş işlər barədə öz fikirlərini bildirdilər. Konfransın sonunda Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək təklif və tövsiyələrini verdi.

# Con Silver ADPU-da “Dərsin planlaşdırılması” mövzusunda treninq keçirib

Martın 1-də Azərbaycan Dövlət Pedaqoji Univesitetində (ADPU) Regional İngilis Dili üzrə məsul şəxs cənab Con Silver professor-müəllimlərlə “Dərsin planlaşdırılması” mövzusunda treninq keçirib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru Nigar Abbaszadə məlumat verərək bildirib ki, Amerika Birləşmiş Ştatlarının (ABŞ) Azərbaycandakı Səfirliyinin mədəniyyət məsələləri üzrə məsul şəxsi xanım Emi Petersonun təşəbbüsü ilə cənab Con Silver fevral ayının 28-dən mart ayının 3-dək Bakıda səfərdə olacaq. Səfərin məqsədi Azərbaycanda tətbiq olunan müxtəlif ingilis dili proqramları ilə tanış olmaqdır. Qeyd edib ki, cənab Con Silver Mərkəzi və Cənubi Amerikanın Regional Proqram üzrə məsul şəxsi kimi Vaşinqtonda iki il fəaliyyət göstərmişdir. O, eyni zamanda Ukraynanın İngilis dili üzrə baş əməkdaşı, Hindistan, Əfqanıstan, Rusiya və Azərbaycanda Soros Tədris



əməkdaşı və Qazaxıstanda Sülh könüllüsü olmuşdur. Cənab Con Silver həm də Tədris Proqramında İncəsənətin beynəlxalq ustad təlimləri üzrə məktəbin məzunudur.

Sonra ABŞ-ın Azərbaycandakı Səfirliyinin İctimai əlaqələr şöbəsinin İngilis dili proqramları üzrə mütəxəssisi Zülfiyyə Şirinova çıxış edərək treninq iştirakçılarına uğurlar arzulayıb və sözü cənab Con Silverə verib. Cənab Con Silver treninq iştirakçılarına slayd vasitəsilə kurikulum, fəal-interaktiv təlim metodları, diskussiya və təlimin digər müasir üsul və yolları əsasında dərsin planlaşdırılmasının və əlaqələndirilməsinin üstünlükləri barədə məlumat verib, həmçinin dialoq formasında keçirilən dərs zamanı tərəflərin bir-biri haqqında lazımi informasiyanı necə əldə etməsini əyani şəkildə nümayiş etdirib. Bunun üçün iştirakçılara suallar paylanılıb. Bu suallar dialoq və müzakirə, eyni zamanda iştirakçıların fəallığı şəraitində cavablandırılıb. Bütövlükdə treninq uğurla keçib.

Sonda xatirə şəkli çəkdirilib.

**Nigar Abbasova**

# “Bizi tanıyın!” layihəsi çərçivəsində konsert proqramı

Martın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin Musiqi və onun tədrisi metodikası kafedrasının müəllim və tələbələri G.Şaroyev adına 11 illik musiqi məktəbində “Bizi tanıyın!” layihəsi çərçivəsində konsert proqramı ilə çıxış etmişlər. Tədbirdə Musiqi və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zemfira Abdullayeva, həmin kafedranın baş müəllimi, Əməkdar incəsənət xadimi, bəstəkar Nailə Mirməmmədli çıxış edərək ADPU-da 1980-ci ildə yaradılmış Musiqi və onun tədrisi metodikası kafedrasının “Musiqi müəllimliyi” ixtisası üzrə musiqi müəllimi hazırlığında əsas baza kafedrası olduğunu diqqətə çatdırdılar. Qeyd olundu ki, bu layihənin keçirilməsinin məqsədi istedadlı şagirdləri universitetimizə cəlb etməkdir. Çıxışlarda abituriyentlərin ixtisas seçimi zamanı məhz bu fakültəyə üstünlük vermələri xüsusi vurğulandı.



Konsertdə I tədris ili tələbələri Aslan Murad oğlu, Elşən Abbaszadə (saz), Rüfət Şahbazov (qarmon), II tədris ili tələbələri Nərgiz Əliyeva, Çinarə Quliyeva, Simuzər Məmmədova (fortepiano), Məhərrəmli Əlişanov (tar), III tədris ili tələbəsi Altay Vəlizaddə (fortepiano), IV tədris ili tələbələri Hikmət Mustafazadə, Məxfirət Hüseynova (vokal), beynəlxalq müsabiqə laureatı Lalə Ağayeva (fortepiano), baş müəllimlər Gülarə Aslanova, Nailə Mirməmmədli, Elmira Həsənova çıxış edərək Azərbaycan və xarici ölkə bəstəkarlarının əsərlərini, eləcə də xalq musiqisi nümunələrini səsləndirdilər.

Tədbirin sonunda məktəbin direktoru Yusif Vəliyev konsertin yüksək səviyədə təşkilinə görə ADPU-nun rəhbərliyinə, tələbələrə və onları hazırlayan müəllimlərə təşəkkür edib, bu layihənin səmərəli nəticə verəcəyinə əmin olduğunu bildirdi.

Sonda xatirə şəkli çəkdirildi.

**Mahirə Mustafayeva**

# Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin növbəti elmi seminarı

Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin növbəti elmi seminarı keçirilmişdir. Qeyd edək ki, elmi seminar 4 №li tədris binasının kitabxanasında Kitabxana-informasiya mərkəzinin əməkdaşları ilə birlikdə keçirilmişdir. Seminarı giriş sözü ilə fakültənin dekanı, pedaqogika üzrə elmlər doktoru Şəhla Əliyeva açmışdır. Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Sədaqət Əliyeva “Məktəbəqədər yaşlı uşaqların milli ruhda tərbiyə edilməsində etnopedaqoji materiallardan istifadənin əhəmiyyəti” mövzusunda çıxış etmişdir.



Elmi seminarda Kitabxana-informasiya mərkəzinin direktoru Azər Hüseynov, şöbə müdirləri Süreyya Əhmədova, Zinharə Həsənova və əməkdaşları iştirak etmişlər. Müzakirələrdə Azər Hüseynov, Sürəyya Əhmədova, fakültə əməkdaşları professor Müseyib İlyasov, dosent Sevil Cəmilzadə, dosent Şərafət Baxışova, dosent Zemfira Vəliyeva, baş müəllim Pərişan Həsənova, baş müəllim Sona Sadıqova, müəllim Münəvvər Məmmədova fəal iştirak etmişlər. Tədbirdə 103-cü qrup tələbəsi Şəfa Məhəmmədzadə, 104-cü qrup tələbələri Günel Hüseynova, Ceyhunə Hüseynova və 187 nömrəli tam orta məktəbin şagirdi Murad şeirlər söyləmişlər.

**Sədaqət Əliyeva,**
**Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının baş müəllim**

# “Bizi tanıyın!” layihəsi çərçivəsində növbəti konsert proqramı

Xəbər verdiyimiz kimi, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsi “Bizi tanıyın!” layihəsini həyata keçirir. Layihə çərçivəsində fakültənin müəllim və tələbələri müxtəlif təhsil müəssisələrində konsert proqramları ilə çıxış edirlər. Növbəti konsert proqramı martın 10-da Müslüm Maqomayev adına 26 nömrəli musiqi məktəbində keçirilib. Fakültənin müəllim və tələbələri məktəb kollektivinin qarşısında konsert proqramı ilə çıxış ediblər. Onların yüksək səviyyəli ifaları məktəbin müəllim və şagirdləri tərəfindən böyük maraqla qarşılanıb. Sonda xatirə şəkli çəkdirilib.



Qeyd edək ki, layihə çərçivəsində konsert proqramlarının digər təhsil müəssisələrində də keçirilməsi nəzərdə tutulur.

# Fizika və texnologiya fakültəsinin növbəti elmi seminarı

Martın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsinin növbəti elmi seminarı keçirilmişdir. Seminarda Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov iştirak etmişdir. Seminarı giriş sözü ilə acan fakültənin dekanı, fizika-riyaziyyat üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov fakültədə elmi seminarların vacibliyindən danışmış, bu seminarların həm müəllimlər, həm də tələbələr üçün əhəmiyyətini qeyd etmişdir. Sonra seminarda Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Fizika İnstitutunun aparıcı elmi işçisi, fizika-riyaziyyat üzrə fəlsəfə doktoru Sakin Cabarov "Yüksək təzyiqlərdə sintez və quruluş tədqiqatları" mövzusunda çıxış etmişdir. Məruzəçi seminarda iştirak edən müəllim və tələbələri maraqlandıran suallara ətraflı cavab vermişdir.Sonda elmi işlər üzrə prorektor, professor A.Zamanov məruzəçiyə maraqlı mühazirə üçün təşəkkür etmiş, belə seminarların mütəmadi keçirilməsinin zəruriliyini qeyd etmişdir.



# ADPU-nun Quba Filialının Novruz şənliyi

18 mart 2017-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin ( ADPU ) Quba Filialının kollektivi Heydər Əliyev adına Mədəniyyət və İstirahət parkında Quba Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə Novruz bayramına həsr olunmuş ümumrayon tədbirində xüsusi bayram nömrələri ilə iştirak etmişdir. Tədbirdə iştirak edən filialın tələbə kollektivi əvvəlcə öz bacarıqlarını nümayiş etdirmiş, milli musiqi alətimiz olan saz havası səsləndirmiş, bahara aid nəğmələr oxumuş, sanamalar demişlər. Sonra filialın təşkil etdiyi qədimi mis qablardan və bayram atributları olan xonça və səmənidən ibarət sərgi nümayiş olunmuşdur.



# ADPU-nun Şəki Filialında Novruz şənliyi

17 mart 2017-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında Novruz bayramı münasibətilə bayram şənliyi keçirilib. Bayram şənliyində filialın direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulov, pofessor-müəllim heyəti və tələbələr iştirak ediblər. Əvvəlcə filialın direktoru, dosent R.Rasulov bütün kollektivi bayram münasibətilə təbrik edib, xoş arzularını bildirib. Çıxış edən müəllim və tələbələr də bayram münasibətilə təbriklərini çatdırıb, bu bayramın xeyirxahlıq, birlik, bərabərlik simvolu olduğunu vurğulayıblar.

Sonra filialda ayrı-ayrı ixtisaslar üzrə təhsil alan tələbələrin hazırladıqları Novruz xonçalarına baxış keçirilib. "Ən yaxşı Novruz xonçası"nın qalibləri olan qruplar münsiflər heyəti tərəfindən elan edilib və mükafatlandırılıb. Bayram şənliyi tonqal ətrafında tələbələrin hazırladıqları bayram proqramı ilə davam edib.

Qeyd edək ki, bayram münasibətilə hazırlanmış xonçalar Tələbə Gənclər Təşkilatının fəalları tərəfindən Şəki şəhərindəki uşaq evində tərbiyə olunan uşaqları təbrik etmək üçün aparılıb. Tələbələr uşaqları hədiyyələr və bayram sovqatı ilə sevindirib, əyləncəli musiqili proqramı ilə çıxış ediblər.



# Tarix və coğrafiya fakültəsində "Yelizavetpol quberniyasında udi kəndləri: biz nə bilirik?" mövzusunda mühazirə dinlənilib

15 mart 2017-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının təşkilatçılığı ilə Bakı Beynəlxalq Multikulturalizm Mərkəzinin "Qafqaz Albaniyasını öyrənirik" layihəsi çərçivəsində "Yelizavetpol quberniyasında udi kəndləri: biz nə bilirik?" mövzusunda müzakirə təşkil edilmişdir. Mühazirəni Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsinin Prezident Kitabxanasının şöbə müdiri, tarix üzrə fəlsəfə doktoru Nazim Mustafa oxumuşdur. Mühazirəçi mənbələrə əsaslanaraq Azərbaycanın qədim köklü soylarından olan udilər haqqında, onların süni şəkildə erməniləşməsi məsələlərindən tələbələrə məlumat vermiş və bir sıra sualları cavablandırmışdır.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Cəbr və həndəsə kafedrasının müdiri, dosent Zahirəli Sadıxova qardaşı **Atamalı Sadıxovun** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi coğrafiya kafedrasının dosenti **Fərrux Həsənlinin** vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İngilis dili və onun tədrisi metodikası kafedrasının dosenti Faidə İsayevaya qardaşı **Cazib İsrafilovun** vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 928
Sayı: 1500
Çapa imzalanıb: 31.03.2017-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.